# LEKSİK NORMA

Müasir Azərbaycan dilinin lüğət tərkibi olduqca zəngindir. Dilimizdə əsl türk sözləri ilə yanaşı, həm formaca, həm də məzmunca türkləşmiş ərəb və fars mənşəli sözlər işlənir. **Leksik normada əsas prinsip** işlədilən sözlərin mənaca aydınlığıdır. Nitqin anlaşıqlı olması üçün sözlərin mənası danışana da, dinləyənə də tam məlum olmalıdır. Danışan öz nitqində alınma sözlərə və ya dialektizmlərə çox yer verərsə, onların mənası, əlbəttə, bütün dinləyicilərə eyni dərəcədə anlaşıqlı ola bilməz.

Azərbaycan ədəbi dilinin lüğət tərkibi zəngin olduğuna görə burada ümumxalq danışıq dilinə, yaxud dialekt və şivələrə məxsus sözlərlə yanaşı alınma sözlərə , rus dili vasitəsilə dünya dillərindən alınmış çoxlu söz və ifadələrə rast gəlirik. Lakin bu sözlərin hamısını ədəbi dilə gətirmək, onları ictimaiyyət arasında işlətmək yolverilməzdir. Leksik normalar sözlərin incəlik, zəriflik, rəvanlıq cəhətdən daha geniş işlənməsi, mənasının asan dərk olunması və s. baxımından uyarlısının müəyyənləşdirilməsi və ədəbi dilə gətirilməsinə xidmət edir. Bu normalara görə bəzi sözlərin ədəbi dildə işlənməsi aşağıdakı hallarda məqbul sayılmır:

**a) Yerli şivə və dialektlər.** Ayrı-ayrı bölgələrin, rayon və kəndlərin şivələrində işlənən sözlər **dialektizmlər** adlanır. Xüsusi sözlər qrupuna daxil olan şivə sözləri məhdud ərazi dairəsində işlənir və əsasən də həmin məhəlli dairədə anlaşılır. Məs.: cəviz (qoz), sərək (ağılsız), soruq (döşəkağı), qəlbi (hündür), [aton]- atan, [nənön]- nənən, [boba]- baba, [kinova]- kinoya, [midalyon]- medalyon, [tırp]- turp, [hayva]- heyva və s. Bədii əsərlərdə şivə sözləri və dialektlərdən istifadə olunmasına baxmayaraq ədəbi dildə, gündəlik nitqimizdə anlaşılmazlıq yaratdığına görə onlardan istifadəyə ehtiyac yoxdur.

**b) Köhnəlmiş, ünsiyyətdə az işlənən sözlər**. Bura tarixizmlər və arxaizmlər daxildir. Dildə sosial həyatın inkişafı ilə bağlı olaraq daim dəyişikliklər baş verir. Bu dəyişiklik təfəkkürdə də getdiyi üçün dildə öz əksini tapır. Beləliklə, bir sıra sözlər köhnələrək dildən çıxır.  Məsələn, çuxa, əba, xış, badya (qab), düng, kəndxuda, suç, çuar (su çuarı) və s.

**c) Loru sözlər və ifadələr.** Məsələn, zırpı (böyük), lələş, qağa, fışqırıq, dürtmək, anqırmaq, bağırmaq, böyürmək və s.

**ç) Sözlərin yerində işlənilməməsi.** Məsələn, Azərbaycan xalqı yaxşı yaşamağa məhkumdur (layiqdir əvəzinə); Biz bunlara müdaxilə göstərməyə (etməyə əvəzinə) çalışdıq; Adama necə də həzz verirdi (ləzzət verirdi əvəzinə). Bu il havaların pis

keçməsilə bağlı qəbahət (çətinlik əvəzinə) yaranmışdır; İcazə verin sizdən bir sual soruşum (sual verim əvəzinə), Ayağım büdrəyib yerə düşdüm cümləsində düşdüm sözü yerində işlənməmişdir, yıxıldım deyilməli idi və s.

**d) Jarqon sözlər.** Alverçilərin, dərvişlərin, aşıqların, balıqçıların, dənizçilərin, ovçuların, eləcə də falçıların, cadugərlərin, əfsunçuların və başqa bu kimi məhdud peşə sahiblərinin danışığında şərti-məxfi mənada bir sıra sözlər, ifadələr işlədilir ki, bunlara **jarqonizmlər** deyilir. Belə sözlər həmin zümrələr arasında işlənir və ancaq onlar tərəfindən başa düşülür. Jarqonizmlər bədii ədəbiyyatda, xüsusən də dedektiv janrda yazılmış bəzi əsərlərdə də işlənir və üslubi çalarlıq yaratmağa hesablanır.

**e) Neologizmlər.** Bir qisim sözlər isə xalqın sosial həyatının təcəssümü kimi əvvəlcə təfəkkürdə, sonra da dildə təzahür tapır.Son illər dilimizə daxil olan, lakin mənası geniş auditoriya tərəfindən anlaşılmayan yeni sözlərdən ədəbi dildə çox istifadə etmək olmaz. Məsələn, hərbiləşmə (militarizm), köçkün (emiqrant), yetəsay (kvorum), çağdaş (müasir), yüzillik (əsr), durum (vəziyyət), özəlləşmə (xüsusiləşmə), soyqırım (genosid), soyad (familiya) və s. kimi sözlər artıq dilimizdə vətəndaşlıq qazanıb. Lakin saxlanc, dönəm, istilikölçən, bilgisayar, duyum, toplum, bağımsız, aday və s. kimi leksik vahidlər dilimizdə hələ tam sabitləşməyib.

**ə) Terminlər.** Dilin lüğət tərkibinə daxil olan terminlər adi ümumişlək sözlərdən fərqlənir. Elm və texnikanın inkişafı ilə əlaqədar Avropa dillərindən alınmış söz-terminlər elmin bu və ya digər sahəsində işlənir və həmin sahə ilə bağlı adamların nitqi üçün xarakterikdir. Məsələn: insult, miningit, xettrik, xavbek, sinekdoxa, epitet, proteza və s. Terminlilik elmi üsluba xasdır. Lakin bədii və publisistik üslublarda dar ixtisas sözlərinə çox yer verilməsi qüsur sayılır. Şifahi nitqdə isə şərait və məqamından asılı olaraq (dərsdə, məşğələdə, mühazirə və ya məruzədə) terminlərə müraciət olunur.

**Leksik normanın pozulmasına nümunələr:**

1. Novruz bayramı günü onlar bizim qapımıza papaq *tulladılar* (atdılar).
2. Humay boşqaba aş *qoydu* (çəkdi).
3. Toyuqlar *yuvalarına* doluşdu ( hinə).
4. Gedib zər *tulladıq* ( atdıq).

5. At *ayaqlarını* şəklədi ( qulaqlarını).
6. Onun *maraqlı* yaddaşı var ( iti).
7. *Aşağıdan yuxarıya* ( yuxarıdan aşağıya) baxanda dağın dibindən axan çay görünürdü.
8. *Axırıncı* zəng günü çox kövrəlmişdik ( son).
9. Kənd itləri *miyoldayırdı* ( hürürdü).
10. *Hündür* ( ali) mərtəbəyə çatmaq onun çoxdan kı arzusu idi.
11. Stəkanlar stola *sərildi (* stola düzüldü).
12. İnci rəfiqəsi üçün boşqaba *aş qoydu* ( çəkdi)
13. Dünən *güclü* ( dəhşətli) qətl hadisəsi törədilmişdi.
14. Lalə onu tanımasınlar deyə qara eynək *geyinmişdi* ( taxmışdı).
15. Quşlar gedib ağaca *oturdular* (qondular).
16. Alma hələ *göy idi* ( yetişməmişdi), yeməli deyildi.
17. Qız südü iri teştə *yaydı* ( tökdü).
18. Anam qonaqlara çay *tökdü* ( süzdü).